**UOT: 339.9**

# DÜNYANIN ƏRZAQ TƏHLÜKƏSİZLİYİNİN ƏSAS AMİLLƏRİ

**Z.Q.QULİYEV**
**Bakı Biznes Universiteti**

*Məqalədə mövcud yararlı torpaqlardan, o cümlədən, əkinə yararlı torpaqlardan səmərəli istifadə edilməsi, dünya ölkələrinin əhalisinin ərzaq təhlükəsizliyinin təmin edilməsində milli iqtisadiyyatın rolunun daha da artırılması və beynəlxalq bazardan asılılığının azaldılması öz əksini tapmışdır.*

*Dünya ölkələrinin əhalisinin ərzaq təhlükəsizliyinin təmin edilməsi və daha da yaxsılasdırılması, habelə fövqəladə hallarda və təbii fəlakətlər zamanı ərzaq təhlükəsizliyinin möhkəmləndirilməsi məqsədilə dövlət ehtiyatlarının yaradılması zəruri hesab edilir.*

***Açar sözlər:*** *ərzaq təhlükəsizliyi, ərzaq ticarəti, diskriminasiya rejimi, torpağın münbitliyi, toxumçuluq deqredasiyası, qiymətlərin dispariteti, fizioloji qida norması, özünütəminetmə*

“Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritəsinin başlıca istiqamətləri”nin təsdiqi və bundan irəli gələn məsələlər haqqında” Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 16 mart tarixli 1897 nömrəli Sərəncamı ilə iqtisadiyyatın mövcud vəziyyətinin dərin təhlili əsasında Strateji Yol Xəritəsinin hazırlanması üzrə müvafiq tapşırıqlar verilmişdir. Buna uyğun olaraq, kənd təsərrüfatı məhsullarının istehsalı və emalı sənayesi sahələrində mövcud vəziyyət müvafiq dövlət orqanlarının, tədqiqat mərkəzlərinin və müstəqil ekspertlərin iştirakı ilə sistemli və əhatəli şəkildə təhlil olunmaqla, silsilə müzakirələr keçirilmiş və müvafiq qiymətləndirmələr aparılmış, bunun əsasında “Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi” (bundan sonra–Strateji Yol Xəritəsi) hazırlanmışdır.

Strateji Yol Xəritəsinin 2016–2020-ci illər ərzində həyata keçirilməsi hesabına ölkədə dayanıqlı inkişaf prinsiplərinə əsaslanmaqla, rəqabətqabiliyyətli kənd təsərrüfatı məhsullarının istehsalı və emalı sektorunun formalaşdırılmasına nail olmaq baxımından əlverişli mühitin yaradılması üçün 9 strateji hədəfin reallaşdırılması nəzərdə tutulur. Bu strateji hədəflər ərzaq təhlükəsizliyinin dayanıqlılığının gücləndirilməsi, kənd təsərrüfatı məhsullarının istehsal potensialının dəyər zəncirinin həlqələri üzrə artırılması, kənd təsərrüfatı sahəsi üzrə istehsal vasitələri bazarının inkişafı və müvafiq resurslara, o cümlədən maliyyəyə çıxışın asanlaşdırılması, kənd təsərrüfatı sahəsində elmi təminatın və təhsilin keyfiyyətinin yüksəldilməsi və məsləhət-informasiya xidmətləri sisteminin inkişaf etdirilməsi, bazar infrastrukturunun inkişafı və istehsalçıların bazara çıxışının asanlaşdırılması, təbii resurslardan dayanıqlı istifadə mexanizmlərinin formalaşdırılması, aqrar sahə üzrə biznes mühitinin təkmilləşdirilməsi və kənd yerlərində rifahın yüksəldilməsi məsələlərini əhatə edir **[1]**.

Ölkənin ərzaq təhlükəsizliyinin təminatı dövlət qarşısında duran ən vacib məsələlərdən biridir. Bu problemi dövlət xarici və daxili təhlükələri aradan qaldıraraq həll edir. Müxtəlif mənbələrdə ərzaq təhlükəsi probleminin fərqli variantları təklif olunur. Belə ki, ərzaq təhlükəsini şərtləndirən amillər kimi əsas ərzaq məhsullarının istehsalının həcminin azalmasını, ərzaq məhsullarının idxalının həcminin artması, aqrar sənaye kompleksinin istehsal potensialının azalmasını, strateji rezervlər, operativ və sığorta ehtiyatlarının çatışmazlığı göstərilmişdir. Uşaçev İ.Q. ərzaq təhlükəsini şərtləndirən daxili amillər sırasına təbii fəlakətləri (quraqlıq, daşqınlar və s.) cəmiyyətdə təbəqələşmənin dərinləşməsi və aztəminatlı əhalinin çəkisinin (payının) artması, kənd təsərrüfatında və ASK-nin digər sahələrində genişlənmiş təkrar istehsalın səviyyəsinin aşağı düşməsi (və ya tamamilə olmaması) xarici faktorlara isə ölkənin onun ayrı-ayrı regionlarının, iri şəhərlərin sənaye mərkəzlərinin ərzaq məhsullarının idxalından asılılığı aid edilir.

Xromov Y. S. xarici faktorlar siyahısına ölkəyə gətirilən keyfiyyətsiz, hətta sağlamlıq üçün təhlükəli ərzaq məhsullarını əlavə etmişdir. Moiseyev Y.V. ərzaq təhlükəsini şərtləndirən əsas amil kimi əhalinin gəlirlərinin aşağı səviyyəsini, daxili istehsalın lazımı səviyyədə olmamasını göstərir, ərzaq təhlükəsini şərtləndirən amilləri 4 əsas qrupa bölürdü:

-ərzaq məhsullarının istehsal həcminin azalması ;

-əhalinin böyük bir hissəsi üçün ərzaq məhsullarının əldə olunmasında iqtisadi baryerlər;

-ərzaq məhsullarının keyfiyyətinin aşağı salınması;

-ərzaq təminatının idxaldan yüksək səviyyədə asılılığı **[4]** .

Ərzaq təhlükəsizliyi-ərzaq sahəsində dövlət maraqlarına cavab verən həyati əhəmiyyəti kompleks daxili və xarici amillərdən asılıdır. Bu amillərin aşkar edilməsi ərzaq təhlükəsizliyinin təmin olunmasında dövlətin taktiki və strategiyasını müəyyənləşdirir. Bu əsasda ölkənin ərzaq təhlükəsizliyinə təsir göstərən əsas daxili amillərə aşağıdakılar aid edilir.

-əkin sahələrinin strukturu və heyvandarlığın yemlə təmin edilmə səviyyəsinin aşağı olması;

-ərzaq məhsulları istehsal edən sahələrdə disporsiyaların mövcudluğu;

-aqrar sektorun istehsal potensialından istifadənin aşağı olması;

-kənd təsərrüfatı xammalı əsasında işləyən emal sənaye müəssisələrinin inhisarçılığı;

-istehsal və bazar infrastrukturunun zəif inkişafı;

-iqtisadiyyatın idarəedilməsinin təşkilatı strukturunun bazar prinsiplərinə adaptasiya edilməsi;

-ərzaq məhsulları istehsal edən sahələrin maliyyə vəziyyətinin ağırlığı;

-əsas istehsal fondlarının köhnəlmə səviyyəsinin yüksəkliyi, aqrar sahənin və yeyinti sənayesinin inkişafı üçün dövlət investisiya dəstəyinin olmaması;

-istehsalçılardan istehlakçılara qədərki mərhələdə ərzaq məhsulları itkilərinə yol verilməsi;

-əhalinin minimal gəlir səviyyəsinin aşağı olması;

Ölkənin ərzaq təhlükəsizliyini çətinləşdirən xarici amillər aşağıdakılardan ibarətdir.

-ölkənin ərzaq idxalından və istehsal amillərindən asılılıq səviyyəsi;

-ölkənin idxal etdiyi qida məhsullarına dünya bazar qiymət konyukturunun təsiri;

-cografi mövqedən asılı olaraq qonşu ölkələrdən daxil olan su ehtiyatlarından asılılıq;

-xarici ölkələrlə ərzaq ticarətinin əlverişsiz şərtləri, bu sahədə beynəlxalq təşkilatlar və dünya birliyi tərəfindən diskriminasiya rejiminin saxlanması, qida məhsulları istehsal edən strateji əhmiyyətli obyektlərin əcnəbi investorların mülkiyyətinə keçməsi.

Dövlətin əsas məqsədi bu təhlükələri minimuma endirməkdir. Hər bir qrup üzrə dövlətin tədbirlər paketi var ki, onların köməyi ilə ərzaqla bağlı problemləri bu və ya digər dərəcədə həll etmək mümkün olur. Ümumi və adambaşına düşən istehsalın həcminin mümkünsüzlüyü prizmasında deyil, ASK-da böhran vəziyyəti nöqteyi nəzərdən yanaşmaq lazımdır **[9]** .

Ölkənin ərzaq təhlükəsizliyinin əsas şərti-özünütəminetmədir. Özünütəminetmə dedikdə ərzaq məhsullarına olan tələbatın daxili istehsal hesabına ödənilməsi başa düşülür.

Azərbaycanda adam başına 0,55 ha kənd təsərrüfatına yararlı torpaq sahəsi düşür. Qeyd etmək lazımdır ki, yalnız bu göstərici kənd təsərrüfatında istehsalın həcmini müəyyənləşdirən səbəblər sırasında əsas fondların yetərincə ödənilməməsi, kənd təsərrüfatı, ərzaq və emal sənayesini material-texniki avadanlıqla təmin edən istehsal sahələrinin qismən və ya tamamilə məhdudlaşdırılması və torpağın münbitliyinin azalması, toxumçuluq sisteminin deqredasiya və s. misal göstərmək olar. Eləcə də, sadə texnologiya kənd təsərrüfatı istehsalının iqtisadi səmərəliliyinin azalmasına, bu isə öz növbəsində yerli məhsulların qiymətlərindəki disparitet, gəlirlərin elə bölgüsünə gətirib çıxarır ki, bu vəziyyət nəinki kənd təsərrüfatında genişlənmiş təkrar istehsal üçün əlverişli şərait yaradır, hətta bu sahənin ixtisarına gətirib çıxarır. Bu baxımdan dövlətin kənd təsərrüfatının dəstəklənməsi (dotasiya və subsidyalar şəklində) çox vacibdir. Bu dəstəyin genişləndirilməsi və ünvanlı şəkildə yönəldilməsi, bu vəsaitlər üzərində ciddi nəzarət (müəyyən proqramlar daxilində) ölkəının ərzaq təhlükəsizliyi probleminin həllində öz müsbət təsirini göstərə bilər. İxtiyari ölkənin kənd təsərrüfatı məhsullarının istehsalının səviyyəsi istehsal faktorunun və dövlət tərəfindən ərzaq təhlükəsizliyinin təmin edilməsi imkanlarının nəticəsi kimi səciyyələnir.

Ərzaq məhsullarına olan tələbatın ödənilməsi baxımından ölkənin potensial imkanlarının qiymətləndirilməsində əsas göstəricilər kimi istehsalın həcmi, adambaşına düşən istehlakın həcmi, ölkənin əsas məhsulları ilə özünütəminatı, import və eksportun səviyyəsini göstərmək olar. Ölkənin ərzaq məhsulları ilə özünütəminetmə səviyyəsi ümumi istehsalın istehlaka nisbəti, fizioloji qida norması ilə müqayisədə faiz göstəricisi ilə müəyyən olunur **[7]** .

ƏKTT dünyanın ərzaq təhlükəsizliyinin səviyyəsini qiymətləndirmək üçün xüsusi metodiki bazadan istifadə edir. Qeyd edək ki, ƏKTT-Beynəlxalq Ərzaq Təhlükəsizliyi Komitəsi qlobal səviyyədə ərzaq probleminin həlli üçün strateji və taktiki yanaşmalar üzərində işləyən bir təşkilatdır. Bu metodiki baza 7 göstəriciyə əsaslanır:

I. Dünya taxıl ehtiyatlarının dünya səviyyəsində taxıl istehlakına olan nisbəti.

II. Dünya ərzaq təhlükəsizliyi o zaman təmin edilmiş hesab edilir ki, dünya əhalisinin illik istehlakının 17%-i həcmində taxıl ehtiyatı mövcud olsun. Başqa sözlə resursu illik istehlakdan əlavə dünya əhalisinin daha 60 günlük tələbatını təmin etmək imkanı versin.

Digər 5 göstərici taxıl idxal edən əsas ölkələrdə vəziyyəti xarakterizə edən göstəricilərdir.

Taxıl ixrac edən ölkələr üçün aşağıdakı göstəricilər xarakterikdir:

III. 5 əsas ixracatçı ölkənin ( Argentina, Avstraliya, Kanada, ABŞ, AB) təklifinin tələbata olan nisbəti;

IV. Bu ölkələrdə taxıl ehtiyatının ümumi istehlakın həcminə nisbəti-ümumi növlər üzrə differensiallaşdırılmış göstəricilər: buğda

(Argentina, Avstraliya, Kanada, ABŞ, AB) yemlik taxıl ( Argentina, Avstraliya, Kanada, ABŞ, AB) və düyü ( Çin, Pakistan, Tailand, ABŞ, Vyetnam).

İdxalçı ölkələr üçün:

V. Taxıl istehsalında dəyişikliklər (Çin, Hindistan və MDV dövlətləri)

VI. Çin və Hindistan istisna olmaqla, inkişaf edən ölkələrdə taxıl istehsalında dəyişikliklər;

VII. Sonuncu göstərici buğda, qarğıdalı və düyünün orta illik ekspert qiymətləridir.

Tələbatın 60 günlük həcminə bərabər olan taxıl ehtiyatları ərzaq təhlükəsizliyinin kritik həddi hesab olunur: "İdxal təhlükəsi meyarı" Bu hədd 0,3-ə bərabər götürülür.

Araşdırmalar göstərir ki, iqtisadiyyatın digər sahələrindən fərqli olaraq aqrar sahənin inkişafı təbii şəraitlə bağlı olduğuna görə bu sahədə məhsuldar qüvvələrin tam formalaşdırılmasında çətinliklər yaranır. Aqrar sahədə məhsuldar qüvvələrin inkişaf səviyyəsi iqtisadiyyatın digər sahələrindən fərqli olaraq zəif inkişaf edir. Aqrar sahədə əmək məhsuldarlığının səviyyəsi digər sahələrlə müqayisədə aşağı olur. Bunun da başlıca səbəblərindən biri aqrar sahənin inkişafının təbii amillərinin təsirinə məruz qalmasıdır. Elə buna görə də kənd təsərrüfatının inkişafının tənzimlənməsi bir tərəfdən dövlət himayəsinə ehtiyacı olan sahə olub bilavasitə dövlətin köməyi ilə inkişaf etdirilir və formalaşır. Digər tərəfdən sahibkarlığın maddi-texniki vasitələrə, infrastruktur maddələrinə, suvarma suyuna , məhsulların emalına, satışına, yeni məhsuldar sortların toxumuna, cins mal-qaraya, mütərəqqi texnologiyanın tətbiqinə, təşkilati işlərə, idarəetmə strukturunun bazar münasibətlərinin tələbləri əsasında yenidən qurulmasına, kadr hazırlığına və s. olan tələbatları əsasında yenidən qurulması nəticəsində aqrar sahədə maliyyə çətinlikləri yaranır ki, bu da nəticədə maliyyə asılılığına gətirib çıxarır **[3]**.

Dünya ölkələri arasında iqtisadi əlaqələrin intensiv olaraq genişlənməsi dövlətlərarası əmtəə məhsulları mübadiləsinə və sərbəst fəaliyyətin həyata keçirilməsinə imkan yaranır, beynəlxalq aləmdə məhsulların, informasiyaların bolluğuna, azad ticarət və alqı- satqinin genişlənməsinə səbəb olar.

Ölkənin ərzaq təhlükəsizliyi problemi daxili və xarici mənbələrdən olan zərərli tendesiyaların təsiri nəticəsində yaranır. Daxili və xarici mənbədən olan zərərli təsirlər ölkənin ərzaq kompleksində destruktiv proseslərə gətirib çıxarır və dövlət paralel olaraq sosial qeyri-stabillik şəraitini yaşayır. Aqrar iqtisadiyyata, o cümlədən ölkənin ərzaq təhlükəsizliyinə zərərli təsir göstərən daxili faktorlar daha çox mənfi təsirə malik olur. Problemə sırf Azərbaycan reallıqlarından yanaşdıqda belə qənaətə gəlmək olur ki, ərzaq təhlükəsizliyi probleminin daxili amilləri respublika iqtisadiyyatında kifayət qədər fəal rol oynamışdır. Belə ki, 80-cı illərin sonu 90-cı illərin əvvəllərindən etibarən məhsul istehsalının ilbəil azalması, onilliklər ərzində mərkəzləşdirilmiş iqtisadi əlaqələr sisteminin dağılması, xammal və material resursları ilə təchizatın pisləşməsi. Qiymətlərin səviyyəsinin yüksəlməsi və iqtisadiyyatda inflyasiya təmayüllərinin genişlənməsi, maliyyə-kredit sektorunda deformasiyalar və nəhayət respublika daxilində etnik-milli, hərbi-siyasi münasibətlərin gərginləşməsi nəticəsində ölkə ərazisinin 20%-ə qədərinin işğala məruz qalması ərzaq təhlükəsizliyi problemində daxili amillərin daha qabarıq təsirinə əyani subutdur.

Ümumilikdə, yuxarıda göstərilmiş faktorlar və ərzaq təhlükəsizliyi istiqamətləri nəzərə alınaraq Azərbaycan dövləti məhz əhalinin ərzaq məhsulları ilə etibarlı surətdə təmin edilməsi üçün 2008-2015-ci illərə dair proqram qəbul etmişdir.

Dövlət proqraminin əsas məqsədi ölkənin hər bir vətəndaşının sağlam və məhsuldar həyat tərzi üçün onun qəbul edilmiş normalara uyğun ərzaq məhsulları ilə tam təmin edilməsinə nail olmaqdır.

Bu məqsədə nail olmaq üçün Dövlət Proqramı çərçivəsində aşağıdakı vəzifələrin yerinə yetirilməsi nəzərdə tutulur:

-ölkədə ərzaq məhsulları istehsalının artırılması;

-əhalinin təhlükəsiz və keyfiyyətli ərzaq məhsulları ilə təmin edilməsi;

-ərzaq təminatı sahəsində risklərin idarə olunmasının təmin edilməsi;

-ərzaq təminatı sisteminin institusional inkişafını həyata keçirmək və sahibkarlıq mühütünün yaxşılaşdırılması;

Yuxarıda göstərilən başlıca və mühüm vəzifələrin yerinə yetirilməsi üçün həyata keçiriləcək tədbirlər ölkədə sabit və adekvat ərzaq təklifinin formalaşdırılmasına, səmərəli istehsal və satış infrastrukturunun yaradılmasına, ərzaq məhsullarının keyfiyyətinə nəzarət sisteminin təkmilləşdirilməsinə və hər bir vətəndaşın ərzaq məhsullarına çıxışının təmin olunmasına yönəldilməsi **[5]** .

Sabit və adekvat ərzaq təklifi, ilk növbədə aqrar sektorda intensiv geniş təkrar istehsalın, o cümlədən kənd təsərrüfatı məhsullarının istehsalının və emalının inkişaf etdirilməsi yolu ilə əldə olunacaq. Bununla yanaşı, təlabatın bir qismi xarici asılılığı nəzarətdə saxlamaq şərti ilə idxal hesabına ödənilməsi.

Nəzərə alınmalıdır ki, iqtisadi qanunlara görə ölkədə istehlak olunan ərzaq məhsullarının 25%-dən çoxu ölkələrdən gətirilirsə, həmin ölkənin ərzaq təminatı təhlükəli sayılır.

Ərzaq təminatı sahəsində dövlət siyasətinin əsas istiqamətlərinin 2015-ci ilə qədər yerinə yetrilməsi üçün konkret olaraq Tədbirlər Planında nəzərdə tutulmuşdur.

Səmərəli istehsal, saxlanılma satış infrastrukturunun yaradılması da ərzaq təminatı sisteminin ən vacib elementlərindəndir. Buna görə də bu sahələrə

dövlət investisiyaları artırılacaq və özəl təşəbbüslərin hərtərəfli dəstəklənməsi;

Ərzaq təklifinin səmərəli bazar mexanizmi vasitəsilə adekvat tələblə qarşılaşması üçün ölkə vətəndaşlarının hər biri istənilən zaman ərzaqla təmin olunma imkanına malik olmalıdır. Bu həmin ictimai resursların aztəminatlı vətəndaşlara birbaşa yönəldilməsi, həm də ödəmə qabiliyyətli tələbin formalaşdırılması vasitəsilə həyata keçrilməsi;

Ərzaq təminatı dövlət siyasətinin əsas istiqamətlərindən biri də əhalinin nəinki kəmiyyətcə, həm də keyfiyyətcə müasir tələblərə cavab verən, ekoloji təmiz məhsullarla təchiz edilməsidir. Bu məqsədlə, keyfiyyət və təhlükəsizliyə səmərəli nəzarət sistemi qurulması;

Ərzaq təminat sisteminin ən mühüm elementlərindən biri ehtimal olunan risklərin səmərəli şəkildə idarə edilməsidir. Bu məqsədlə, qarşıdakı illərdə zəruri həcmidə dövlət ərzaq ehtiyatlarının yaradılması və onun müasir tələblər səviyyəsində idarə edilməsidir. Bu məqsədlə qarşıdakı illərdə zəruri həcmdə dövlət ərzaq ehtiyyatının yaradılması və onun müasir tələblər səviyyəsində idarə edilməsi təmin olunmalı, qabaqcıl sığorta mexanizmlərinin tətbiqinin genişləndirilməsi;

Nəzərdə tutulmuşdur ki, ərzaq təminat sisteminin institusional inkişafı diqqət mərkəzində saxlanılacaq, aqrar bölmənin elmi və kadr potensialı gücləndiriləcək, sahibkarığın inkişafı üçün qabaqcıl modellərin tətbiqi və dövlət tərəfindən maliyyə dəstəyi genişləndiriləcəkdir **[6]** .

İlk növbədə həyati zərurət olan torpaq və sudan istifadənin səmərəliliyinin artırılması tədbirləri nəzərdə tutulmuşdur. Həmin kompleks tədbirlər içərisində xüsusi əhmiyyəti olan tədbirlər aşağıdakılardır.

-torpaqların münbitliyinin və suvarılan torpaq sahələrinin artırılması;

-çirklənmiş deqradasiyaya uğramış torpaqların əkin dövriyyəsinə cəlb edilməsinin stimullaşdırılması;

-əkin yararlı torpaqlarda tikintilərin aparılmasının qarşısının alınması;

-pay torpaqları əsasında formalaşmış xırda ailə və fermer təsərrüfatlarının könüllülük əsasında kooperasiyalarda birləşmənin stimullaşdırılması;

-kənd təsərrüfatı istehsalçılarına suvarma suyunun çatdırılması mexanizminin təkmilləşdirilməsi;

-suvarmada mütərəqqi texnologiyanın tətbiqi;

-ətraf mühütün (torpaq və suyun) müntəzəm olaraq ekoloji monitorinqinin aparılması və müvafiq məliumatların istehsalçılara çatdırılması;

Bitkiçiliyin inkişaf etdirilməsi tədbirləri:

-bitkiçilik məhsullarının istehsalında növbəli əkin sisteminin yerli şəraitdə uyğun aparılması üçün müvafiq tədbirlərin həyata keçrilməsi;

-kənd təsərrüfatı bitkilərinin bölgülər üzrə optimal əkin strukturunun və istehsal həcminin müəyyənləşdirilməsi, müvafiq tövsiyələr fermerlərə çatdırılması;

-yeni məhsuldar sortların sınaqdan keçirilməsi və rayonlaşdırılması;

-məhsuldar və keyfiyyətli buğda toxumlarının stimullaşdırılması və daxili təlabatın ödənilməsi;

-taxılın vaxtında və itkisiz yığılması üçün müvafiq texniki və digər zəruri tədbirlərin həyata keçirilməsi;

-taxıla olan dövlət ehtiyacının tənzimlənmə mexanizminin işlənib hazırlanması;

-müasir aqrotexniki tədbirlərə əməl olunması, qabaqcıl texnologiyaların tətbiqi və əkinçilik mədəniyyətinin artırılmasının təşviq olunması; rayon dövlət toxum müfəttişinin maddi- texniki bazasinin möhkəmləndirilməsi və laboratoriyasının modernləşdirilməsi;

-azot istehsal edən zavodun tikilməsi.

Ölkədə inkişaf tədbirində faraş kartof və tərəvəzin, yaşıl çay yarpağının, meyvə bağlarının, üzümçülüyün, zeytun bağlarının, şəkər çuğunduru və yağlı bitkilərin, çəltikliyin və digər bitkilərin əkin sahələrinin genişləndirilməsi nəzərdə tutulmuşdur **[8]** .

Tədbirlər planında eyni zamanda heyvandarlığın inkişaf etdirilməsi istiqamətində də kompleks tədbirlər nəzərdə tutulmuşdur. Xüsusilə ölkədə damazlıq işinin genişləndirilməsi və təkmilləşdirilməsi, yem bazasının intensiv texnologiyalar əsasında inkişafı, ətlik maldarlığın inkişaf etdirilməsi, quşçuluğun, ət, süd və digər ərzaq məhsulları istehsal edən müəssisələrin modenləşdirilməsi və yenilərinin yaradılması nəzərdə tutulmuşdur.

Bundan başqa balıqçılığın, arıçılığın inkişaf etdirilməsi nəzərdə tutulmuşdur.

Tədbirlər planında həmçinin digər kompleks tədbirlər:

-ərzaq məhsulları istehsalının infrastruktur təminatın yaxşılaşdırılması;

-melorasiya və su təsərrüfatının inkişaf etdirilməsi;

-baytarlıq xidmətinin səmərəliliyinin artırılması;

-ərzaq məhsullarının təhlükəsizliyi və keyfiyyətininə nəzarətin gücləndirilməsi;

-fövqəladə vəziyyətə hazırlıq və dövlət ərzaq ehtiyatının yaradılması;

-ərzaq məhsulları istehsalına maliyyə dəstəyinin göstərilməsi;

-sahibkarlıq fəaliyyətinin dəstəklənməsi;

-aqrar sahənin elmi təminatının yaxşılaşdırılması və kadr potensialının yüksəldilməsi nəzərdə tutulmuşdur.

-Ümumilikdə 2008-2015-ci il üçün müəyyən olunmuş çoxsahəli və çoxşaxəli iqtisadi və siyasi təhlükəsizlik proqramı ölkə əhalisinin ərzaq məhsulları ilə təmin edilməsində xüsusi əhmiyyətə malikdir.

Dövlət proqramının 2015-ci il üçün icra meyarlarını təşkil edən hədəf göstəriciləri aşağıdakılardır:

-dənli bitkilərin əkin sahəsi -900 min hektar;

-taxıl istehsalı-2.8 milyon ton;

-məhsuldarlıq-32 sentner;

-ət istehsalı-340 min ton;

-süd istehsalı-2.4 milyon;

-quş əti istehsalı-80 min ton **[2]**

**ƏDƏBİYYAT**

1. Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 16 mart tarixli 1897 nömrəli Sərəncamı ilə iqtisadiyyatın mövcud vəziyyətinin dərin təhlili əsasında Strateji Yol Xəritəsinin hazırlanması üzrə sərəncam. 2. Abbasov İsmət Dursun oğlu. Ərzaq təhlükəsizliyi və kənd təsərrüfatının prioritet istiqamətləri. Bakı, 2011. 3. Aqil Əliyev, İdris Dadasov, Arif Səkərəliyev. Dünya iqtisadiyyatı: müasir dövrün problemləri. Bakı -2001 4. Xəlilov Həmzə Agakisi oglu. Milli ərzaq təhlükəsizliyi: bazar transformasiyaları və iqtisadi qloballasma amilləri Bakı , “Adiloglu” nəsriyyatı -2001 5. Nusrəddin Məmmədov. Ölkənin iqtisadi təhlükəsizliyi. Bakı 2005 6. Rasim Əliyev. Aqrar bazar və ərzaq təhlükəsizliyi məsələləri Bakı 2005 7. http://musavat.com/news/gundem Ərzaq-təhlükəsizliyi-strateji-məqsəddir 8. Quliyev E.A. Etibarlı ərzaq təminatı sistemi: kooperasiya və inteqrasiya problemləri. Bakı, 2013

**Основные критерии безопасности продуктов мира**

**З.Г.Гулиев**

Рашиональное полбзование земельными угоднями обеспечение продовольственной безопасносты населения мировых страны. Повышение роли национальной промышленности и нашло отражение уменьшение зависимости от международного рынка.

Безопасность и уличшение обеспечением и уличшением снабжения населения мира особо важно создание государственного запаса на случой черезвычайных ситуауны и природных катакмизмах.

***Ключевые слова:*** *продовольственная безопосность, продовальственная торговля, режим дискрименации, норма питания, самообеспечение, мюдорогие земле, семенная деградация, дисперитет цен*

**The main factors of world food safety**

**Z.G. Guliyev**

In the article the effective use of useful land, including sowing lands, the further increasing of role of national economy in providing of world counties populations’ food security and the reduction of dependence on the international market are have been reflected.

For the purpose of providing of the food security of the population of the world countries and its improving, also enhancement of food security in emergency situations and during natural occasions the creation of state reserves are considered necessary.

***Keywords:*** *food security, food trade, discrimination mode, soil fertility, seeding degradation, disparity of prices, physiological food norm, self-governance.*

**zakirquliyev@inbox.ru**